*© "Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.132-138* *e-ISSN 2617-751X*

**UOT:** 719.; 930.85.
**KBT:** 79.
**MJ №** 159

# Azərbaycanın maddi-mədəni irsinin qorunmasında Heydər Əliyevin rolu

**Anar Ağalarzadə***
**Samir Kərimov****

**Abstrakt.** Məqalədə Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin mədəni irsə olan diqqəti və qayğısı, tarixin qədim sirlərini özündə əks etdirən arxeoloji abidələr, qoruqların yaradılması və muzey işi siyasətindən bəhs olunur. Qeyd edilir ki, Azərbaycanın tarix və mədəniyyət abidələrinin hərtərəfli tədqiqində, zəngin mədəni və mənəvi irsinin dünyaya çatdırılmasında Heydər Əliyevin çox böyük rolu olmuşdur. Onun bu fəaliyyəti respublikanın gələcək mənəvi-siyasi həyatı üçün örnək və mədəni irsə münasibəti baxımından mühüm əhəmiyyətə malik idi. Heydər Əliyevin tarixin qorunması üçün misilsiz xidmətləri müasir dövr tariximizin şanlı salnaməsinə çevrilmiş və özündən sonrakı siyasi varislərinə də bu iş uğurla ötürülmüşdür.

**Açar sözlər:** maddi mədəniyyət, tarix və arxeoloji abidələr, tarixi qoruqlar, orta əsr şəhər yerləri

## 1.Giriş

Azərbaycan qədim, zəngin və unikal tarixi mədəniyyətə malik diyardır. Xalqımız minilliklər ərzində saysız-hesabsız, gözəl orijinal abidələr yaratmışlar. Bizə miras qalmış bu tarix və mədəniyyət abidələrini qorumaq üçün Azərbaycanın sabitliyi əsas meyarlardan biridir. Ölkəmizin qədim irsinin təbliği və yüksək dəyərləndirilməsində tarix boyu bir çox

* Tarix üzrə fəlsəfə doktoru, dosent,
AMEA Arxeologiya, Etnoqrafiya və Antropologiya İnstitutunun aparıcı elmi işçisi; Bakı, Azərbaycan (məsul müəllif)
E-mail: anararxeoloq@mail.ru
https://orcid.org/0000-0003-3140-4617
** Tarix üzrə fəlsəfə doktoru,
AMEA Lənkəran Regional Elmi Mərkəzin aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: samir-cayrud@mail.ru
https://orcid.org/0000-0002-3736-6191

**Məqaləyə istinad:** Ağalarzadə, A., & Kərimov, S. [2023] Azərbaycanın maddi-mədəni irsinin qorunmasında Heydər Əliyevin rolu. *"Metafizika" jurnalı, 6*(1), səh.132-138.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 13.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 13.02.2023*
*Çapa qəbul edilmişdir: 14.03.2023*

şəxsiyyətlərin xidmətləri olmuşdur. Belələrindən biri də xalqımızın Ümummilli Lideri Heydər Əliyev olmuşdur.

Azərbaycanın tarix və mədəniyyət abidələrinin hərtərəfli tədqiqində, zəngin mədəni və mənəvi irsinin dünyaya çatdırılmasında Heydər Əliyevin çox böyük rolu olmuşdur. Onun bu fəaliyyəti respublikanın gələcək mənəvi-siyasi həyatı üçün nadir örnək və mədəni irsə münasibəti baxımından mühüm əhəmiyyətə malik idi.

**2.Arxeoloji qoruqların yaradılması konsepsiyası**

Heydər Əliyevin zəngin tarixi keçmişə daim diqqət və qayğısı hələ Sovetlər Birliyi dönəmində Azərbaycana rəhbərliyi zamanı özünü büruzə vermişdir. Onun bilavasitə göstərişi ilə bir sıra abidələrdə iri miqyaslı arxeoloji tədqiqatlar aparılmış, aşkar olunmuş arxeoloji abidələr, xüsusilə də orta əsrlərin möhtəşəm qalaları və şəhər tipli yaşayış yerləri dövlət qoruğu elan edilmişdir [2, s.11]. Bu tipli abidələrdən biri də Azərbaycan EA Tarix İnstitutu *“Arxeologiya və etnoqrafiya sektoru”*nun Rəşid Göyüşovun rəhbərliyi altında daimi fəaliyyət göstərən “Şirvan-Şabran” arxeoloji ekspedisiyasının arxeoloji qazıntılar nəticəsində aşkar etdiyi Şabran şəhər yeridir. Bakı-Xaçmaz magistral yolunun 139-cu km-də, Şabran rayonu ərazisində yerləşmiş bu arxeoloji abidənin qazıntıları nəticəsində onun, həqiqətən də, Azərbaycanın orta əsr möhtəşəm şəhəri olduğu sübuta yetirildi. Şəhər qazıntıları haqqında sensasiyalı xəbərlər tez bir zamanda ictimaiyyətin diqqətini cəlb etdi. Hələ o zaman Heydər Əliyev şəxsən Şabranda olmuş və şəhər yerində aparılan qazıntılarla maraqlanmışdır.

Dövlətin tarixi abidələrin mühafizəsinin qayğısına qalması ilə əlaqədar olaraq Şabran şəhərinin bir neçə qanunla rəsmiləşdirildi. Orta əsr şəhər yeri Azərbaycan respublikasının 20 oktyabr 1999-cu ildə qoşulduğu “Arxeoloji irsin mühafizəsi haqqında” 16 yanvar 1992-ci il tarixli Avropa Konvensiyasına və “Tarix və mədəniyyət abidələrinin qorunması haqqında” 10 aprel 1998-ci il tarixli Azərbaycan Respublikası Qanununun 22 və 23-cü maddələrinə əsasən, Azərbaycan respublikası Mədəniyyət Nazirliyinin 20 fevral 2002-ci il tarixli 58 saylı əmri ilə “Şabran Tarix və Mədəniyyət Qoruğu” elan edilmişdir.Ümümmilli Lider tərəfindən hələ XX əsrin 70-ci illərindən başlayaraq tarix və mədəniyyət abidələrinin qorunması ilə baglı verdiyi fərmanlarla Bakıda İçərişəhər, Şəki, Şuşa, Ordubad və Çıraqqala kimi abidələr də qoruq elan olunmuşdur [1, s.7]. Məhz onun Azərbaycanın qədim şəhərlərinə və həmin şəhərlərdə yerləşən arxeoloji, tarixi-memarlıq abidələrinə yüksək səviyyədə qayğısı bu şəhərlərin tarixi simasının qorunmasında müstəsna əhəmiyyət kəsb etmişdir.

**3.Azərbaycanın neft strategiyası və arxeoloji irs**

Unudulmaz dövlət xadiminin gərgin əməyi respublikada iqtisadiyyatın güclənməsi ilə yanaşı, tarixi abidələrə olan qayğısında da müşahidə edilirdi. Ölkədə XX əsrin 90-cı illərinin əvvəllərində baş verən siyasi hərc-mərclik, digər tərəfdən xarici şirkətlərin zəngin karbohidrogen ehtiyatlarına malik Azərbaycana sərmayə qoymaq üçün gəlişi və buna mane olmaq istəyən antimilli qüvvələrin zərərsizləşdirilməsi onun peşəkar bir dövlət başçısı olmasının bariz nümunəsi idi. Məhz Heydər Əliyev öz uzaqgörənliyi ilə hər bir işin öhdəsindən gəldi. Ölkə daxilindəki siyasi qarışıqlığı yatırdı və xarici şirkətlərin investisiya maraqlarını Azərbaycana cəlb etməklə gələcəyin güclü iqtisadiyyatının əsasını qoymuş oldu. Ulu öndərin fəaliyyəti nəticəsində 1994-cü il sentyabrın 20-də dünyanın ən iri neft şirkətləri ilə *"Əsrin layihəsi"* müqaviləsi imzalandı. Xəzərin zəngin karbohidrogen yataqlarından hasil ediləcək neft və qazın Avropa və dünya bazarlarına çıxarılması inşasına 2001-ci ildən başlanılan Bakı-Tbilisi-Ceyhan (BTC) neft və Cənubi Qafqaz qaz Boru Kəmərləri (CQBK) marşrutlarının gerçəkləşməsi ilə nail olundu. Hər iki boru kəmərinin çəkilişi zamanı ölkəmizin qədim tarixi keçmişini özündə əks etdirən yeraltı mədəni sərvətləri - çoxlu sayda arxeoloji abidələr üzə çıxarılaraq tədqiq edildi. Neft və qaz kəmərlərinin çəkilişini həyata keçirən əməliyyatçı BP və ARDNŞ ilə AMEA Arxeologiya və Etnoqrafiya İnstitutu arasında kəmər boyu aparılacaq arxeoloji kəşfiyyat və əsaslı qazıntı işləri barədə müqavilə imzalandı. 2001-ci ildən bu kəmərlərin başlanğıc nöqtəsi olan Səngəçal terminalından Gürcüstan sərhədinə qədər 442 km məsafədə arxeoloji monitorinq işləri aparıldı və bu zaman 100-dən çox arxeoloji abidələr qeydə alındı. Razılaşmaya əsasən, dağıntı təhlükəsindən uzaq olmaq üçün bu abidələrin xeyli hissəsindən yan keçilmiş və 40-a yaxın abidədə əsaslı arxeoloji qazıntı işləri aparılması qərara alınmışdır [8].

BTC boru kəməri üzərində fəaliyyət göstərən arxeoloji ekspedisiya 2001-2005-ci illər ərzində minlərlə maddi mədəniyyət nümunəsi üzə çıxartmışdır. Bu layihə zamanı aşkar olunmuş tapıntıları tədqiqatçılar haqlı olaraq XX əsrin 50-ci illərində Mingəçevir SES-in inşası zamanı tapılmış çoxsaylı tapıntılarla müqayisə edirlər.

Boru kəmərləri üzərində aparılmış arxeoloji qazıntılar zamanı əldə olunan nailiyyətlər Azərbaycan tarixinə qızıl hərflərlə yazılan səhifələrdən birinə çevrilmişdir. Bununla bağlı 2005-ci ilin dekabr ayında Bakıda "Qafqazın arxeologiyası, etnoqrafiyası və folkloru" adlı Beynəlxalq elmi praktik konfrans keçirildi. Konfransda Rusiya, Gürcüstan, Dağıstan alimləri ilə yanaşı, ABŞ və Böyük Britaniyadan dəvət olunmuş tədqiqatçılar da iştirak etmiş və "Əsrin müqaviləsi" çərçivəsində həyata keçirilən BTC və Cənubi

Qafqaz əsas ixrac neft-qaz boru kəmərlərinin çəkilişi zamanı aşkarlanmış arxeoloji irsin tədqiqinin Qafqaz regionu üçün çox müsbət əhəmiyyətini vurğulamışlar.

**4.Erməni yalanlarına arxeoloji tədqiqatlarda cavab**

Heydər Əliyevin tarixi yaşatmaq konsepsiyası daima davamlı olmuşdur. Ulu öndər ermənilərin Naxçıvana torpaq iddialarına cavab olaraq Muxtar Respublika ərazisində arxeoloji tədqiqatların aparılması haqqında verdiyi göstərişlə elmdə böyük yeniliklərə nail olundu. Onun bilavasitə göstərişi ilə 2001-2003-cü illərdə Naxçıvan MR ərazisinə arxeoloji ekspedisiyalar təşkil olunmuş və çoxlu sayda arxeoloji abidələr tədqiq edilmişdi. Bu arxeoloji tədqiqatların ən önəmlisi Ermənistanla həmsərhəd olan Naxçıvanın Ordubad rayonu ərazisindəki Qaranquş yaylasında yerləşən, Kiçik Qafqazın ən hündür zirvəsi olan Qapıcıq dağındakı Gəmiqaya petroqliflərinin tədqiqidir. Gəmiqayada aparılmış arxeoloji tədqiqatlar və tapılmış qayaüstü təsvirlərin tədqiqi elm aləminə maraqlı məlumatlar verdi. Bu qayalar üzərində 1500-dən çıx qayaüstü təsvirlər tədqiq edilmiş, Gəmiqayada tunc dövrü insanlarının yarımköçəri yaylaq maldarlığına aid yurd yerləri aşkarlanmışdır. Tədqiqatlar nəticəsində e.ə. III minilliyin əvvəllərində Naxçıvanın yerli əhalisinin əsas məşğuliyyətində yaylaq maldarlığının üstün mövqe tutması faktı ortaya çıxdı [5, s.11-12].

Həm dövlət başçısı, həm də vətənpərvər insan kimi Heydər Əliyevin milli mədəniyyətə, mənəvi irsə göstərdiyi hörmət, verdiyi dəyər toxunduğu hər bir sahədə özünü göstərir. O çıxışlarının birində deyirdi: “Dünyada yaşayan azərbaycanlılar öz ana dilini, dinini, milli ənənələrini heç zaman unutmamalıdırlar. Hər bir azərbaycanlı fəxr etməlidir ki, onun böyük tarixə, qədim, zəngin mədəniyyətə malik Azərbaycan kimi vətəni vardır!”

İşgüzar yaxud qeyri-rəsmi səfərləri zamanı Heydər Əliyev Dağlıq Qarabağ probleminin Azərbaycan mədəniyyətinə vurduğu zərbədən, tarixi abidlərin talan edilməsindən, müharibə şəraitinin mədəniyyətin inkişafına mənfi təsirindən mütləq söz açmış və erməni vəhşiliklərindən dəlil-sübutlar təqdim etmişdir.

**5.Muzey işi siyasəti tarixi dəyərlərin qorunması yolunda**

Sovet dövründə bir çox tədqiqatçılar yekdilliklə Azərbaycan maddi mədəniyyət sərvətlərinin qoruyucusu olan muzeylərin əsasının yalnız Azərbaycanda sovet hakimiyyətinin qurulması ilə qoyulduğunu qeyd edir və bunu elmdən kənar faktlarla sübut etməyə çalışırdılar [3, s.3]. Lakin statistik məlumatlara əsasən, sovet hakimiyyəti qurulduqdan sonra Azərbaycanda muzeylərin sayı lazımi qədər artmamışdır. Məhz Ümummilli Liderin Azərbaycana ötən əsrin 70-ci illərində rəhbərlik etdiyi dönəmdə, 1982-ci ilin

statistikasına əsasən, 83 muzey fəaliyyət göstərirdi [4]. 1980-ci ildə onun təşəbbüsü və rəhbərliyi ilə respublikada muzey işinə aid xüsusi qərar qəbul edildi. Həmin qərara əsasən respublikada Mədəniyyət Nazirliyinin mərkəzi aparatında Muzeylər İdarəsi yaradılmış, Muzey işi üzrə Respublika Elmi-Metodiki Mərkəzi, muzey ekspozisiyalarının bədii tərtibatı emalatxanası, muzey sərvətləri və xatirə əşyalarının bərpa mərkəzi təşkil olunmuşdur [6, s.167].

Müstəqilliyimizin bərpasından sonra, xüsusən də Heydər Əliyevin hakimiyyətə qayıdışı ilə digər sahələr kimi milli muzey işi sahəsi də sürətlə inkişaf etməyə başladı. Dövlətin muzeylərə qayğısının bariz nümunəsi kimi "Muzeylər haqqında" Azərbaycan Respublikası Prezidentinin 24 mart 2000-ci il tarixli Qanunu göstərmək olar. Bundan başqa Azərbaycanda milli muzey işinə xarici təcrübənin tətbiq edilməsi də dövlətin muzey və mədəni abidələrin mühafizəsi istiqamətində atdığı mühüm addımlardan biridir.

**6.Nəticə**

Tarixi yalnız tarixi şəxsiyyətlər yaşada bilirlər. Azərbaycan tarixi də bu yüksək şərəfə layiq olan və yaşadılmasında xidmətləri olan xadimlər yetişdirmişdir. Heydər Əliyevin tarixin qorunması üçün misilsiz xidmətləri müasir dövr tariximizin şanlı salnaməsinə çevrilmiş və özündən sonrakı siyasi varislərinə də bu iş uğurla ötürülmüşdür [7, s.95]. Umümilli Liderin layiqli davamçısı Cənab prezident İlham Əliyev də Azərbaycanın tarixi sərvətinə və arxeoloji irsinə həmişə böyük həssaslıq yanaşmışdır. Bu gün işğaldan azad olunmuş torpaqlarımızda aparılan böyük quruculuq işləri və həyata keçirilən Böyük Qayıdış proqramının tərkib hissələrindən biri kimi Qarbağın tarixi-arxeoloji abidələrinin tədqiqi və bərpasına xüsusi diqqətin ayrılması qeyd olunan mədəniyyət siyasətinin uğurlu davamıdır.

## ƏDƏBİYYAT


**1.** Abbasova, F.Ə. (2002). *Şabran*. Bakı: "Elm". 280 s.

**2.** *Heydər Əliyev və mədəni irs*. Bakı:2014, 272 s.

**3.** Ağayev, R.Ə. (2002). *Muzeyşünaslıq*. Bakı. 650 s.

**4.** *Heydər Əliyev və muzeylərimiz*. Bakı: 1999, 200 s.

**5.** Müseyibli, N.Ə. (2004). *Gəmiqaya*. Bakı. 316 s.

**6.** Ələkbərov, R. (2006). Muzeylər və dövlət siyasəti. *"Mədəniyyət dünyası" elmi nəzəri məcmuə* (XIII buraxılış). Bakı. s.164-170.

**7.** Ərəstunoğlu, R. (2007). *Əbədiyaşar dahi insan...*Bakı: "Araz", 119 s.

**8.** Teylor, M.P., Polqleyz, K.P., Müseyibli, N.Ə. & başqaları. (2011). *Boru kəməri dəhlizində keçmiş və gələcək irs. Azərbaycan, Gürcüstan, Türkiyə*. ABŞ Smitsoniya İnstitutu (Azərbaycan və ingilis dillərində), 239 s.

*“Metafizika” Journal*
***2023, vol 6, issue 1, serial 21, pp. 132-138***

## Роль Гейдара Алиева в защите материально-культурного наследия Азербайджана

**Анар Агаларзаде**[*]
**Самир Каримов**[**]

**Абстракт.** В статье отражены выводы о внимании и заботе Общенационального Лидера азербайджанского народа Гейдара Алиева о культурном наследии, создании археологических памятников и заповедников, отражающих древние тайны истории и политике музейного дела. Авторами отмечена важная роль Гейдара Алиева во всестороннем изучении исторических и культурных памятников Азербайджана и донесении до мира его богатого культурного и духовного наследия. Эта деятельность Гейдара Алиева явилась образцом для будущей духовно-политической жизни республики и имела большое значение с точки зрения его отношения к культурному наследию. Беспримерные заслуги Гейдара Алиева в сохранении истории стали славной летописью нашей новейшей истории, и эта работа успешно передается его политическим преемникам.

**Ключевые слова**: mатериальная культура, историко-археологические памятники, исторические заповедники, средневековые городские поселения

## The role of Heydar Aliyev in protecting the material-cultural heritage of Azerbaijan

[*] доктор исторических наук, доцент,
ведущий научный сотрудник Института Археологии, Этнографии и Антропологии НАНА; Баку, Азербайджан (ответственный автор)
E-mail: anararxeoloq@mail.ru
https://orcid.org/0000-0003-3140-4617
[**] доктор исторических наук,
Ведущий научный сотрудник Ленкоранского регионального научного центра НАНА; Баку, Азербайджан
E-mail: samir-cayrud@mail.ru
https://orcid.org/0000-0002-3736-6191
**Цитировать статью:** Агаларзаде, А., & Каримов, С. [2023]. Роль Гейдара Алиева в защите материально-культурного наследия Азербайджана. *Журнал «Metafizika», 6(1),* с.132-138.

**История статьи:**
*Статья поступила в редакцию: 13.01.2023*
*Отправлена на доработку: 13.02.2023*
*Принята для печати: 14.03.2023*

**Anar Agalarzade***
**Samir Karimov****

**Abstract.** In the article is dealt with the attention and care of the National Leader of the Azerbaijani people Heydar Aliyev to the cultural heritage, the creation of archaeological monuments and reserves, reflecting the ancient mysteries of history and the policy of museum work. It is noted that Heydar Aliyev played a great role in the comprehensive study of the historical and cultural monuments of Azerbaijan and in conveying its rich cultural and spiritual heritage to the world. This activity of Heydar Aliyev was an example for the future spiritual and political life of the republic and was of great importance in terms of his attitude to cultural heritage. Heydar Aliyev's unparalleled services for the preservation of history have become glorious annals of our modern history, and this work has been successfully passed on to his political successors.

**Keywords:** material culture, historical and archaeological monuments, historical preserves, the medieval city sites

## REFERENCES

1. Abbasova, F.E. (2002). *Shabran*. Baku: "Science". 280 p.
2. *Heydar Aliyev and cultural heritage.* Baku: 2014, 272 p.
3. Agayev, R.A. (2002). *Museology*. Baku. 650 p.
4. *Heydar Aliyev and our museums.* Baku: 1999, 200 p.
5. Museyibli, N.A. (2004). *To the ship*. Baku. 316 p.
6. Alekbarov, R. (2006). Museums and public policy. "*World of Culture" scientific theoretical compilation* (XIII issue). Baku. pp.164-170.
7. Erastunoglu, R. (2007). *An eternal genius..*.Baku: "Araz", 119 p.
8. Taylor, M.P., Polglaze, K.P., Museyibli, N.A. & et al. (2011). *Past and Future Heritage in the Pipeline Corridor. Azerbaijan, Georgia, Turkey*. US Smithsonian Institution (in Azerbaijani and English), 239 p.

* Doctor of philosophy in history, associate professor,
Leading researcher of ANAS Institute of Archaeology, Ethnography and Anthropology; Baku, Azerbaijan (corresponding author)
E-mail: anararxeoloq@mail.ru
https://orcid.org/0000-0003-3140-4617
** Doctor of philosophy in history,
Leading researcher of ANAS Lankaran Regional Scientific Center; Baku, Azerbaijan
E-mail: samir-cayrud@mail.ru
https://orcid.org/0000-0002-3736-6191

**To cite this article:** Agalarzade, A., & Karimov, S. [2023]. The role of Heydar Aliyev in protecting the material-cultural heritage of Azerbaijan. *"Metafizika" journal, 6(1),* pp.132-138.

**Article history:**
*Received: 13.01.2023*
*Accepted: 14.03.2023*